 

# ILHAM ALIYEV'S GREEN ENERGY POLICY: SERVING THE BRIGHT FUTURE OF HUMANITY




**Irada Huseynova**[1]

**UDC:** 94.; 502/504
**LBC:** 63.3; 20.1
**HoS:** 44
**DOI:** 10.33864/2790-0037.2025.v6.i1.5-21

**Keywords:**

Environmental protection,
Green energy,
Wind and solar energy,
President Ilham Aliyev,
COP29,
Climate change

## ABSTRACT

The article talks about COP29, the 29th session of the Conference of the Parties to the UN Framework Convention on Climate Change, which is taking place in Baku. It is noted that our country is currently expanding its activities in the direction of improving the environment, restoring and increasing greenery, using water resources efficiently and using sustainable energy sources. The article reports that issues of extreme importance for our planet and our people are discussed at various events organized every day within the framework of COP29, and relevant decisions are announced. The decisions taken by COP29 are of historic importance for the future of humanity. The article provides detailed information based on factual material for the discussion of issues such as global warming, extreme weather events and depletion of non-renewable natural resources. Hosting one of the most prestigious UN events in Azerbaijan means that our country supports another global initiative and thereby further increases its authority among the countries of the world.

[1] Doctor of historical sciences, professor,
Head of the "History of Caucasian Peoples" department of Baku State University; Baku, Azerbaijan
E-mail: huseynova.irada.m@gmail.com
https://orcid.org/0000-0003-4879-8026
**To cite this article:** Huseynova, I. [2025]. Ilham Aliyev's Green Energy Policy: Serving the Bright Future of Humanity. *History of Science journal*, *6*(1), pp.5-21.
https://doi.org/10.33864/2790-0037.2025.v6.i1.5-21

***Article history:***
*Received: 06.12.2024*
*Accepted: 28.02.2025*



AcademyGate Publishing
p-ISSN 2790-0029; e-ISSN 2790-0037

# İLHAM ƏLİYEVİN YAŞIL ENERJİ SİYASƏTİ: BƏŞƏRİYYƏTİN İŞIQLI GƏLƏCƏYİNƏ XİDMƏT KİMİ




**İradə Hüseynova**[1]

**UOT:** 94.; 502/504
**KBT:** 63.3; 20.1
**HoS:** 44
**DOI:** 10.33864/2790-0037.2025.v6.i1.5-21

**Açar sözlər:**

Ətraf mühitin qorunması,
Yaşıl enerji,
Külək və günəş enerjisi,
Prezident İlham Əliyev,
COP29,
İqlim dəyişikliyi

## ANNOTASİYA

Məqalədə BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının Bakıda keçirilən 29-cu sessiyası- COP29-dan bəhs olunur. Qeyd edilir ki, hazırda ölkəmizdə ətraf mühitin sağlamlaşdırılması, yaşıllıqların bərpası və artırılması, su ehtiyatlarından və dayanıqlı enerji mənbələrindən səmərəli istifadə istiqamətində fəaliyyətlər genişlənməkdədir. Müəllif COP29 çərçivəsində hər gün təşkil edilən müxtəlif tədbirlərdə planetimiz və xalqlarımız üçün son dərəcə vacib əhəmiyyət kəsb edən problemlərin müzakirə edildiyini bildirərək, qəbul edilən müvafiq qərarlar barədə məlumat verir. COP29-un qəbul etdiyi qərarlar bəşəriyyətin gələcəyi üçün tarixi əhəmiyyət kəsb edən qərarlardır. Məqalədə qlobal istiləşmə, ekstremal hava hadisələri və bərpa olunmayan təbii sərvətlərin tükənməsi kimi məsələlərin müzakirəsi ilə bağlı faktoloji materiallara əsaslanmaqla ətraflı məlumat verilir. BMT-in ən mötəbər tədbirlərindən birinin Azərbaycanda keçirilməsi ölkəmizin daha bir qlobal təşəbbüsü dəstəkləməsi və bununla da, dünya ölkələri arasında nüfuzunun daha da artması deməkdir.

[1] Tarix elmləri doktoru, professor,
Bakı Dövlət Universitetinin "Qafqaz xalqları tarixi" kafedrasının müdiri; Bakı, Azərbaycan
E-mail: huseynova.irada.m@gmail.com
https://orcid.org/0000-0003-4879-8026
**Məqaləyə istinad:** Hüseynova, İ. [2025] İlham Əliyevin Yaşıl Enerji Siyasəti: Bəşəriyyətin İşıqlı Gələcəyinə Xidmət Kimi. *History of Science jurnalı*, *6*(1), səh.5-21.
https://doi.org/10.33864/2790-0037.2025.v6.i1.5-21

***Məqalənin tarixçəsi:***
*Məqalə redaksiyaya daxil olmuşdur: 06.12.2024*
*Təkrar işlənməyə göndərilmişdir: 06.01.2025*
*Çapa qəbul edilmişdir: 28.02.2025*



AcademyGate Publishing
p-ISSN 2790-0029; e-ISSN 2790-0037

# ПОЛИТИКА ЗЕЛЕНОЙ ЭНЕРГЕТИКИ ИЛЬХАМА АЛИЕВА: СЛУЖЕНИЕ СВЕТЛОМУ БУДУЩЕМУ ЧЕЛОВЕЧЕСТВА




**Ирада Гусейнова**[1]

**УДК:** 94.; 502/504
**ББК:** 63.3; 20.1
**HoS:** 44
**DOI:** 10.33864/2790-0037.2025.v6.i1.5-21

**Ключевые слова:**

Охрана окружающей среды,
Зеленая энергетика,
Ветровая и солнечная энергия,
Президент Ильхам Алиев,
COP29,
Изменение климата

## АННОТАЦИЯ

В статье рассказывается о COP29- 29-й сессии Конференции сторон Рамочной конвенции ООН об изменении климата, проходящей в Баку. Отмечается, что в настоящее время в нашей стране расширяется деятельность в направлении улучшения окружающей среды, восстановления и увеличения озеленения, эффективного использования водных ресурсов и устойчивых источников энергии. В статье сообщается, что проблемы, имеющие чрезвычайно важное значение для нашей планеты и нашего народа, обсуждаются на различных мероприятиях, организуемых каждый день в рамках COP29, и сообщаются соответствующие решения. Решения, принятые COP29, имеют историческое значение для будущего человечества. В статье представлена подробная информация, основанная на фактическом материале, для обсуждения таких вопросов, как глобальное потепление, экстремальные погодные явления и истощение невозобновляемых природных ресурсов. Проведение одного из самых престижных мероприятий ООН в Азербайджане означает, что наша страна поддерживает еще одну глобальную инициативу и тем самым еще больше повышает свой авторитет среди стран мира.

[1] Доктор исторических наук, профессор,
Заведующий кафедрой «Истории народов Кавказа» Бакинского государственного университета; Баку, Азербайджан
E-mail: huseynova.irada.m@gmail.com
https://orcid.org/0000-0003-4879-8026
**Цитировать статью:** Гусейнова, И. [2025]. Политика Зеленой Энергетики Ильхама Алиева: Служение Светлому Будущему Человечества. *Журнал History of Science*, *6*(1), c.5-21.
https://doi.org/10.33864/2790-0037.2025.v6.i1.5-21

***История статьи:***
*Статья поступила в редакцию: 06.12.2024*
*Отправлена на доработку: 06.01.2025*
*Принята для печати: 28.02.2025*



 

***1.Giriş***

*“Mən Bakı nailiyyətini çoxtərəfliliyin təntənəsi kimi qiymətləndirirəm. COP29 iqlim diplomatiyasında dönüş nöqtəsidir və mən inanıram ki, bu irs gələcək qlobal iqlim fəaliyyətinə müsbət təsir göstərəcək”.*

İlham Əliyev,
Azərbaycan Respublikasının Prezidenti

Ekoloji tarazlığın qorunub saxlanması, təbii ehtiyatlardan rasional istifadə edilməsi, su, torpaq və atmosfer havasının çirklənmədən mühafizə edilməsi hazırda planetimiz miqyasında ən ciddi problemlərindən birinə çevrilmişdir. İnsanın həyat fəaliyyəti nəticəsində ətraf mühitə dəyən zərərlərlə bağlı problemlər artıq Qədim Romada da mövcud olmuşdur. Roma imperiyası dövründə Apennin yarımadasında sıx palıd və fıstıq meşələri kəsilərək məhv edilmiş, yamaclarda isə tikanlı kolluqlar çoxalmışdı. Eramızdan qabaqkı dövrdə belə, insanlar havanın və suyun çirklənməsi ilə qarşılaşırdılar. Buna səbəb isə faydalı qazıntıların hasilatı, şəhərlərin və əkinçiliyin inkişafı idi. Bu inkişaf XIV-XVI əsrlərdə məhz epidemiyalara gətirib çıxardı, insanlar kütləvi surətdə məhv oldular, suyun çirklənməsi müxtəlif xəstəliklərə səbəb oldu və s. Qeyd etmək istərdik ki, ətraf mühitin qorunması istiqamətində fəaliyyət göstərən müxtəlif qurumlar məhz XIX əsrdən etibarən yaranmağa başlamışdılar. Ətraf mühitin mühafizəsi üzrə ilk ictimai təşkilatlardan biri Londonda 1898-ci ildə yaradılmışdı və “Kömür smoqu ilə mübarizə cəmiyyəti” adlanırdı. Amerikada 1892-ci ildə yaradılan “Syerra” klubunun fəaliyyəti sayəsində Yosemit milli parkı və “Böyük kanyon” parkı yaradıldı. Beləliklə, adıçəkilən parkların ərazisində ağacların kəsilməsinin və faydalı qaznıtıların çıxarılmasının qarşısını almaq nisbətən mümkün oldu.

Ölkəmizdə ekoloji problemlərə - təbii ehtiyatlardan səmərəli istifadə məsələlərinə və təbii mühitin əvvəlki kimi qorunub-saxlanması, hava, su hövzələri və torpaq örtüyünün çirklənmədən mühafizə edilməsi problemlərinə kifayət qədər diqqətlə yanaşılır və bu istiqamətdə lazımi işlər görülür. Ulu Öndər Heydər Əliyev bununla bağlı demişdir: *“...Təbiətin ölkəmizə bəxş etdiyi zəngin sərvətlərə xüsusi qayğı ilə yanaşmaq, belə misilsiz xəzinələri bəşəriyyətin gələcəyi naminə qorumaq üzərimizə düşən başlıca vəzifələrdəndir...”*. Ölkə rəhbərliyi tərəfindən ətraf mühitin qorunması, ekoloji balansın təmin edilməsi, ekoloji təmizliyin saxlanması məsələlərinə yetərincə böyük önəm verilir. Azərbaycan Respublikası Konstitusiyasının 39-cu maddəsində (Sağlam ətraf mühitdə yaşamaq hüququ) göstərilir: “I. Hər kəsin sağlam ətraf mühitdə yaşamaq hüququ vardır. II. Hər kəsin ətraf mühitin əsl vəziyyəti haqqında məlumat toplamaq və ekoloji hüquqpozma ilə əlaqədar onun sağlamlığına və əmlakına vurulmuş zərərin əvəzini almaq hüququ vardır. III. Heç kəs ətraf mühitə, təbii ehtiyatlara qanunla müəyyən edilmiş hədlərdən artıq təhlükə törədə və ya zərər vura bilməz. IV. Dövlət ekoloji tarazlığın saxlanılmasına, yabanı bitkilərin və vəhşi heyvanların qanunla müəyyən edilmiş növlərinin qorunmasına təminat verir”. Əsas Qanun 78-ci maddədə təsbit edir ki, “Ətraf mühitin qorunması hər bir şəxsin borcudur”. [6]

Konstitusiya müddəalarına uyğun olaraq Azərbaycan Respublikasının Milli Məclisi tərəfindən bu istiqamətdə zəngin hüquqi baza yaradılmışdır. Belə ki, 1997-ci ildə “Əhalinin radiasiya təhlükəsizliyi haqqında”, 2000-ci ildə “Xüsusi mühafizə olunan təbiət əraziləri və obyektləri haqqında”, 2001-ci ildə “Atmosfer havasının mühafizəsi haqqında”, 2002-ci ildə “Əhalinin ekoloji təhsili və maarifləndirilməsi haqqında”, 2014-cü ildə “Yaşıllıqların mühafizəsi haqqında” və s. qanunlar qəbul edilmişdir.

2004-cü ilin 21 oktyabrında “Azərbaycan Respublikasında alternativ və bərpa olunan enerji mənbələrindən istifadə olunması üzrə Dövlət Proqramı”nın təsdiq edilməsi haqqında

Azərbaycan Respublikası Prezidentinin sərəncamı imzalanmışdır. Dövlət Proqramında göstərilir ki, "... *yerləşdiyi əlverişli coğrafi mövqe və iqlim şəraiti dünyanın inkişaf etmiş ölkələrində olduğu kimi, Azərbaycanda da ekoloji cəhətdən təmiz bərpa olunan enerji mənbələrindən geniş istifadə edilməsinə imkan verir. Bu, istilik elektrik stansiyalarında yandırılan böyük miqdarda yanacağa qənaətlə yanaşı, ətraf mühitə atılan zərərli tullantıların miqdarını da xeyli azaldar. Ölkənin təbii potensialından istifadə etməklə alternativ enerji mənbələrinin elektrik və istilik enerjisi istehsalına cəlb edilməsi elektroenergetikanın gələcək inkişaf istiqamətlərində mütərəqqi dəyişikliklər etməyə imkan yaradar*". [7]

Məlum olduğu kimi, Azərbaycanın yerləşdiyi region, ölkəmizin fiziki-coğrafi mövqeyi elədir ki, burada günəşli günlərin sayı buludlu günlərin sayı ilə müqayisədə il ərzində daha çox üstünlük təşkil edir və əbəs yerə Vətənimizi "günəşli Azərbaycan" adlandırmırlar. Bu bir faktdır ki, dünyanın 11 iqlimindən 9-nun yerləşdiyi Azərbaycanda günəşli saatların miqdarı il ərzində 2400-3200 saat təşkil edir. Abşeron yarımadası, Bakı şəhəri həmçinin güclü küləklərin (Xəzri, Gilavar) daim əsdiyi regionlardandır. Ölkəmizin ərazisində külək və günəş enerjisindən istifadə imkanları çox genişdir. Xüsusilə, ölkənin Abşeron yarımadası, Xəzər dənizi sahili zolağı və şimal-qərb hissəsində olan adalar, Azərbaycanın qərbində Gəncə-Daşkəsən zonası və Naxçıvan Muxtar Respublikasının Şərur-Culfa ərazisi bu baxımdan əlverişli ərazilərdir.

Bu sahədə institusional potensialı artırmaq məqsədilə 2009-cu ildə "Azərbaycanda Alternativ və Bərpa Olunan Enerji Mənbələri üzrə Dövlət Agentliyi" yaradılmışdır. Sonradan bu Agentlik ləğv edilmiş və Azərbaycan Respublikası Prezidentinin 2020-ci il 22 sentyabr tarixli 1159 nömrəli Fərmanı ilə Azərbaycan Respublikasının Energetika Nazirliyi yanında Bərpa Olunan Enerji Mənbələri Dövlət Agentliyi yaradılmışdır. [8]

### *2.Ekologiyanın qorunub-saxlanması və ekoloji problemlərin həlli*

Dövlətimizin rəhbərliyi tərəfindən ekologiyanın qorunub-saxlanması və ekoloji problemlərin həlli daim diqqət mərkəzindədir. Xatırladaq ki, Azərbaycan Respublikasının Prezidenti tərəfindən Azərbaycan Respublikasında 2024-cü il "Yaşıl dünya naminə həmrəylik ili" elan edilmişdir. Azərbaycan Respublikasında 2024-cü ilin "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamında göstərilir ki, "Azərbaycanın 2030-cu ilə qədər sosial-iqtisadi inkişafa dair beş milli prioritetindən biri "Təmiz ətraf mühit və yaşıl artım ölkəsi" kimi müəyyən edilmişdir. Həmin prioritetə uyğun olaraq, ətraf mühitin sağlamlaşdırılması, yaşıllıqların bərpası və artırılması, su ehtiyatlarından və dayanıqlı enerji mənbələrindən səmərəli istifadənin təmin edilməsi istiqamətində işlər aparılır.

Azərbaycan baza ili (1990) ilə müqayisədə 2030-cu ilə qədər istilik effekti yaradan qazların emissiyalarının 35 faiz, 2050-ci ilə qədər isə 40 faiz azaldılmasını hədəf kimi götürmüşdür". [9] Ölkə Prezidenti İlham Əliyev Qarabağ və Şərqi Zəngəzuru "yaşıl enerji" zonası elan edib və 2022-2026-cı illər üzrə tədbirlər planı təsdiqlənib. Bu ərazilərin 2050-ci klədək "Netto sıfır emissiya" zonasına çevrilməsi nəzərdə tutulur.

Hazırda ölkəmizdə ətraf mühitin sağlamlaşdırılması, yaşıllıqların bərpası və artırılması, su ehtiyatlarından və dayanıqlı enerji mənbələrindən səmərəli istifadə istiqamətində fəaliyyətlər genişlənməkdədir. 44 günlük Vətən müharibəsi nəticəsində Azərbaycan əraziləri işğaldan azad edilmiş, 1 günlük antiterror tədbirlərindən sonra isə suverenliyimiz bütün ölkə ərazisində bərqərar olmuşdur. Hazırda Qarabağ regionunda və Şərqi Zəngəzurda tikinti-bərpa işləri və yenidənqurma prosesləri geniş vüsət almışdır, burada bir sıra yaşayış məskənləri artıq "ağıllı şəhər" və "ağıllı kənd" layihələri əsasında qurulur, dağılmış ekosistem yenidən bərpa edilir.

Hamıya yaxşı bəllidir ki, respublikamız ənənəvi olaraq neft və qaz hasil edən, karbohidrogen ehtiyatlarını Avropaya nəql edən ölkədir. Lakin dövlət səviyyəsində aparılan düşünülmüş və müdrik siyasət nəticəsində alternativ enerji mənbələrinə, bu mənbələrdən yararlanmaqla, "təmiz enerji" – "yaşıl enerji" istehsalına da kifayət qədər prioritet diqqət yetirilir.

Bu yaxınlarda Bakıda Cənub Qaz Dəhlizi Məşvərət Şurası çərçivəsində nazirlərin 10-cu və Yaşıl Enerji Şurası çərçivəsində nazirlərin 2-ci iclasları təşkil edilmişdi. 2023-cü il fevralın 3-də Bakıda Cənub Qaz Dəhlizi Məşvərət Şurası çərçivəsində nazirlərin 9-cu və Yaşıl Enerji Şurası çərçivəsində nazirlərin 1-ci iclasları keçirilmişdi. Hələlik, cəmi 4 ölkənin iştirak etdiyi Yaşıl Enerji Şurası çərçivəsində nazirlərin ilk iclasında çıxış edən cənab İlham Əliyevin sözlərinə görə, Azərbaycan çox böyük həcmdə yaşıl enerji potensialına malikdir. Belə ki, dənizdə külək enerjisinin potensialı 157 qiqavat, quruda külək və günəş enerjisinin potensialı 27 qiqavatdır, İkinci Qarabağ müharibəsi nəticəsində işğaldan azad olunmuş ərazilərdə isə 10 qiqavata yaxındır. 2023-cü ilin oktyabr ayında Xəzər regionunda və MDB məkanında ən böyük Günəş Elektrik Stansiyası istismara verilmişdir. Azərbaycan "Qara Dəniz Yaşıl Kabel" layihəsi sayəsində Avropaya yaşıl enerji ixrac edən əsas ölkələrdən biri olacaq.

Məlum olduğu kimi, ötən əsrin axırlarında – 1992-ci ildə Rio-de-Janeyro şəhərində baş tutan Yer Sammitində BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyası imzalanmışdır. COP (Conference of Parties) bu Konvensiyanın icrasına nəzarət edən qurumdur. Ölkəmiz 18 iyul 2000-ci ildə "Birləşmiş Millətlər Təşkilatının "İqlim dəyişmələri haqqında" Çərçivə Konvensiyasına dair" 1997-ci il dekabrın 11-də Yaponiyanın Kioto şəhərində qəbul olunmuş Protokola qoşulmuşdur. Kioto Protokolu qlobal istiləşməyə səbəb olan istixana qazlarının atmosferə tullantılarını məhdudlaşdırır. Birləşmiş Millətlər Təşkilatının İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyası ilə bağlı Tərəflərin 21-ci Konfransında qəbul olunmuş Paris Sazişi 2016-cı ildə təsdiq edilmişdir.

COP21-də qəbul edilmiş Paris Sazişinin 2-ci maddəsində göstərilir ki, "Bu Saziş Konvensiyanı və onun məqsədlərini daha səmərəli həyata keçirməklə, aşağıdakılar vasitəsilə, davamlı inkişaf və yoxsulluğu aradan qaldırmaq üzrə səylər kontekstində iqlim dəyişmələri təhlükəsinə qlobal cavab tədbirlərini gücləndirmək məqsədi daşıyır: (a) həyata keçiriləcəyi təqdirdə, iqlim dəyişmələrinin risk və təsirlərini əhəmiyyətli dərəcədə azaldacağını qəbul edərək, qlobal ortalama temperatur artımının sənayeləşmə dövrünə qədərki səviyyədən 2°C-dən xeyli aşağı saxlanılması və temperatur artımının 1.5°C-dək məhdudlaşdırılması üçün səy göstərilməsi; (b) ərzaq istehsalını təhlükəyə atmayacaq bir şəkildə iqlim dəyişmələrinin mənfi təsirlərinə uyğunlaşma qabiliyyətinin artırılması, iqlim dəyişmələrinə qarşı dayanıqlılıq və istixana effektli qaz tullantılarının azaldılması üzrə inkişafın gücləndirilməsi; və (c) maliyyə axınlarının istixana effektli qaz tullantılarının azaldılmasına və iqlim dəyişmələrinə qarşı davamlı inkişafa yönəldilməsi". [10]

### *3.2024-cü ildə keçirilən COP29 haqqında*

2024-cü ildə yaşıl dünya naminə keçirilən dünya miqyaslı tədbirlərdən ən əhəmiyyətlisi BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası – COP29-dur. Azərbaycan bu dünya miqyaslı, böyük qlobal əhəmiyyət kəsb edən tədbirə ev sahibliyi etmiş, onu yüksək səviyyədə təşkil etmişdir.

Məlum olduğu kimi, ölkəmiz indiyə qədər beynəlxalq statuslu və ümumdünya əhəmiyyətli bir çox mötəbər tədbirlərin təşəbbüskarı olmuş, onlara ev sahibliyi etmiş və bu yüksək nüfuzlu toplantıların məhz yüksək səviyyədə keçirilməsini təmin etmişdir. Bunlardan 2011-ci ildən başlayaraq paytaxtımızda keçirilən Bakı Beynəlxalq Humanitar forumlarını, həmçinin Ümumdünya Mədəniyyətlərarası Dialoq forumlarını, Dünya Dini Liderlərinin II sammitini, BMT-nin Sivilizasiyalar Alyansının Qlobal Forumunu və s.

mühüm tədbirləri göstərmək olar. Artıq COP29 da həmçinin bu mühüm əhəmiyyətli tədbirlər sırasında yer almışdır.

Qeyd edək ki, COP-a ev sahibliyi bir qayda olaraq BMT-nin beş regional qrupu arasında rotasiya edir. Hər regional qrup, üzvlərindən bu konfransı təşkil edəcək bir ölkəni irəli sürmək üçün konsensusla qərar qəbul etməlidir. 2024-cü il COP29-a ev sahibliyi etmək növbəsi Şərqi Avropa regional qrupuna düşürdü. Sözügedən qrupa daxil olan ölkəmiz konfransın Azərbaycanda keçirilməsini təklif etmişdi. Azərbaycanla yanaşı, Ermənistan və Bolqarıstan da öz namizədliklərini irəli sürmüşdülər.

2023-cü il dekabrın 7-də Azərbaycan Respublikası Prezidentinin Administrasiyası və Ermənistan Baş nazirinin Aparatı arasında aparılmış birbaşa danışıqların nəticəsi olaraq verilmiş birgə bəyanatda Ermənistan Azərbaycanın xeyrinə öz namizədliyini geri çəkdi. Daha sonra Bolqarıstan da öz namizədliyini geri götürdü.

Azərbaycanın təşkilata sədrliyinə dair qərar da məhz Şərqi Avropa Qrupu ölkələrinin yekdil rəyi əsasında verildi.

Bütün COP konfranslarının məqsədi sənayedən əvvəlki dövrdə və 2015-ci il Paris Sazişinin tələb etdiyi kimi, karbon qazının miqdarını və qlobal temperatur artımını 1,5 dərəcə Selsi ilə məhdudlaşdırmaqdır. COP tədbirlərinin keçirilməsi hədəflərindən biri də inkişaf etmiş ölkələr tərəfindən inkişaf etməkdə olan ölkələrə iqlim dəyişikliyinin təsirini azaltmaq və uyğunlaşmaqda kömək etmək üçün maliyyə yardımı üçün fond toplamaqdır.

Bu günlərdə öz işini böyük müvəffəqiyyətlə başa vuran COP29 hazırda bütün dünyanın diqqətində olan, hər kəsi maraqlandıran və narahat edən məsələləri özündə ehtiva edirdi. Burada ən əhəmiyyətli məsələlərdən biri dünyamız üçün prioritet olan ekologiyadır. Dünyada ekoloji tarazlığın qorunması və ətraf mühitin gələcək nəsillərə olduğu kimi ötürülməsi aktuallığı getdikcə daha da güclənən problemə çevrilmişdir. Dünyanın hər bir ölkəsi demək olar ki, iqlim dəyişikliyinin fəsadları ilə üzləşdiyindən COP29 dünya üçün son dərəcə mühüm bir tədbir hesab oluna bilər. İqlim dəyişikliklərinin artıq lokal deyil, qlobal xarakter daşıması bütün ölkələrin bu bəlaya qarşı mübarizədə birləşməsini, birgə fəaliyyət göstərməsini zəruri edir.

COP tədbirləri hər il keçirilir və Bakıda bu günlərdə başa çatan COP29-a qədər sonuncu sayılan COP28 Dubayda təşkil edilmişdi. Yüz minə yaxın nümayəndəni bir araya gətirən COP28 BMT-nin tarixində ən genişmiqyaslı tədbir olmuşdur. Konfrans çərçivəsində təşkil edilmiş Zirvə toplantısına 120-dən artıq dövlət və hökumət başçısı qatılmışdı. Sözügedən tədbirdə ilk dəfə olaraq Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev həmçinin iştirak etmişdir.

Azərbaycanda keçirilən COP29-a gəlincə isə, qeyd etməyi məqsədəuyğun sayırıq ki, qlobal önəm daşıyan bu tədbir çox fəlsəfi, insanlığı düşündürən problemlərlə bağlı dərin bir müzakirə platformasına çevrilmişdir.

Noyabrın 12-də ölkəmizin paytaxtı Bakı şəhərində BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının (COP29) Liderlər Sammitinin açılış mərasimi keçirilmişdir. Bu möhtəşəm tədbirdə Prezident İlham Əliyev çıxış etmiş və bildirmişdir: "Ötən ilin dekabrında təxminən 200 ölkənin yekdil qərarı ilə Azərbaycana COP29-a ev sahibliyi etmək şərəfi verildi. Biz bu qərarı ölkəmizə olan hörmətin əlaməti, beynəlxalq arenada oynadığımız fəal rolun dəyərləndirilməsi kimi görürük.

Azərbaycan Şimal ilə Cənub, Qərb ilə Şərqin qovuşduğu ölkədir və bu, təkcə coğrafiya ilə bağlı deyil. Biz müxtəlif beynəlxalq iştirakçılar arasında siyasi, mədəni, enerji, ticari və nəqliyyat körpülərini sala bilərik. Azərbaycanın başladığı meqalayihələr artıq Avrasiyanın enerji və daşımalar yollarını dəyişib və məhsuldar, çoxtərəfli əməkdaşlıq formatının qurulması ilə nəticələnib". [11]

Bakıda keçirilən COP29-a dünyanın 197 ölkəsindən 80 minə yaxın nümayəndə qatılmışdır. Konfrans çərçivəsində hər gün təşkil edilən müxtəlif tədbirlərdə planetimiz və xalqlarımız üçün son dərəcə vacib əhəmiyyət kəsb edən problemlər müzakirə edilmiş və müvafiq qərarlar qəbul edilmişdir. Planetimizin gələcək taleyi Bakıda müzakirə edilmişdir. COP29 tarixə ilklərə imza atmaqla düşmüşdür. Azərbaycan ədalətli və şəffaf, inklüziv və nəticəyönümlü yanaşma nümayiş etdirmişdir.

Noyabrın 12-də BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası (COP29) çərçivəsində Yaşıl Zonada "Gənclər iqlim fəaliyyətlərinin ön cəbhəsində" mövzusunda keçirilən konfransda Azərbaycanın Birinci vitse-prezidenti Mehriban Əliyeva iştirak etmiş və demişdir: "Azərbaycan COP29-a ev sahibliyi etmək öhdəliyini üzərinə götürməklə, Qlobal Cənub və Qlobal Şimal, eləcə də inkişaf etmiş və inkişaf edən ölkələr arasında körpülər salmağa çalışır. Məqsədimiz bu məsələnin həllinə verdiyimiz töhfəni ortaq gələcəyə verəcəyimiz töhfəyə çevirməkdən ibarətdir. Bununla belə, bəzi hallarda dəstək vermək və konstruktiv dialoq aparmaq əvəzinə, biz çoxsaylı qərb mətbuatında böhtan və qarayaxma kampaniyalarının hədəfinə çevrilmişik COP29 siyasi hücumlar arenası deyil. O, iqlim böhranı qarşısında hamımızın birləşdiyi məkandır.Yalnız ədalətli əməkdaşlıq və real tədbirlərə hazırlıq bizi uğura aparacaq". [12]

Qeyd etdiyimiz kimi, COP29 bütün bəşəriyyəti narahat edən, planetimizi təhdid edən iqlim dəyişikliyinin müzakirə edildiyi mötəbər bir tədbir olmuşdur. İqlim dəyişikliyi problemi öz həllini tapmadıqca, ildən-ilə daha da kəskin xarakter almaqdadır. COP29-da iştirak edən BMT-nin Baş katibi Antonio Quterreş bununla bağlı "həyəcan təbili" çalaraq demişdir: "Bütün dövlət nümayəndələrinə müraciət etmək istəyirəm ki, artıq itirməyə vaxtımız qalmayıb. İnsanlar, dövlətlər iqlim dəyişmələrinə qarşı mübarizə üçün vəsait ayırmalıdırlar. Əks halda, bu, bəşəriyyətə baha başa gələcək. İqlim maliyyələşməsi xeyirxah əməl deyil, bu, bir investisiyadır. Bu, ixtiyari məsələ deyil, məcburi məsələdir. Hər ikisi əvəzolunmaz tədbirdir, bunlar bəşəriyyətin gələcəyi və firavanlığı üçün lazımdır".

### *4.İqlim dəyişmələrinin ən kəskin təsirinə məruz qalan ölkələr*

Noyabrın 13-də COP29 çərçivəsində Bakıda COP29 çərçivəsində inkişaf etməkdə olan kiçik ada dövlətlərinin (SIDS) Sammiti keçirildi. SIDS iqlim dəyişmələrinin mənfi təsirlərinə məruz qalan həssas ölkələr kateqoriyasında yer almaqdadır. Adalardan ibarət və sahil ölkələrini öz sıralarında birləşdirən alyans mütəmadi olaraq dəniz səviyyəsinin artmasını və qlobal istiləşmənin digər fəsadlarını beynəlxalq müzakirələrin gündəliyinə çıxarır. Alyansa 39 dövlət və beş müşahidəçi ölkə daxildir.

Məlum olduğu kimi, iqlim dəyişmələrinin ən kəskin təsiri ilə üzləşən ölkələr məhz kiçik ada dövlətləridir. Qlobal temperaturun 1,5 dərəcədə saxlanması ada dövlətləri üçün olduqca vacibdir. Sammitdə çıxış edən Prezident İlham Əliyev qeyd etmişdir ki "İqlim dəyişmələri hər bir ölkəyə, o cümlədən Azərbaycana təsir göstərir. Görürük ki, Xəzər dənizi ilbəil daha da dayazlaşır. Görürük ki, çaylarımızda daha az su, dağlarımızda daha az qar var. Əfsuslar ki, keçmişdə heç vaxt görmədiyimiz daşqınlar və kəskin yağışlar bu gün reallıqdır. Bir sözlə, hər bir ölkə təsirə məruz qalır, lakin kiçik ada dövlətləri üçün bu ekzistensial təhlükədir". Azərbaycan kiçik ada dövlətlərinə özünün birmənalı dəstəyini nümayiş etdirir. Fəlakət qarşısında zəif olan bir sıra ölkələrə qasırğa, zəlzələ və daşqınların təsirini azaltmaq üçün yardım göstərmişdir. Azərbaycanın Qoşulmama Hərəkatında dördillik sədrliyi dövründə ölkəmiz 80-dən artıq ölkəyə, o cümlədən 20 kiçik ada dövlətinə maliyyə və humanitar yardım göstərmişdir. BMT-nin Baş katibi Antonio Quterreş də həmçinin inkişaf etməkdə olan kiçik ada dövlətlərinin böyük ədalətsizliklərlə üzləşdiyini, iqlim dəyişmələrinin, artan qiymətlərin, COVID-19 pandemiyasının bu ölkələrə ciddi ziyan vurduğunu, onların hökumətlərinin çətin vəziyyətdə olduqlarını vurğulayıb. A.Quterreş G20 ölkələrinin dünyada hava çirkləndiricilərinin 80 faizinin yaranmasına cavabdeh olduğunu da

xatırladaraq kiçik ada dövlətlərinin nümayəndələrinə xitabən deyib: “...Baş verən bu ədalətsizlik, dənizlərin səviyyəsinin yüksəlməsi sizin adaların gələcəyini təhlükə altına alır, sakinlər təbii fəlakətlərdən əziyyət çəkir, iqtisadiyyata böyük zərbə dəyir. Bu ədalətsizliyə son qoyulmalıdır”.

Dövlətimizin rəhbəri İlham Əliyev tədbirdə neokolonializm və iqlim dəyişmələri məsələsinə toxunaraq demişdir: “Fransa və Niderlandın xüsusən də Karib dənizi və Sakit Okean regionundakı dırnaqarası dəniz əraziləri iqlim dəyişmələrinin ən ciddi təsirinə məruz qalanlar sırasındadır. Artan dəniz səviyyəsi, kəskin hava şəraiti və biomüxtəlifliyin pozulması həmin regionlara ciddi təhlükə yaradır. Həmin icmaların səsi bir çox hallarda onların metropoliyalarındakı rejimləri tərəfindən susdurulur.

Yeni Kaledoniya, Fransa Polineziyası, Mayot, Vallis və Futuna, Korsika, Reunion, Qvadelupa, Martinika, Fransa Qvianası, Sen-Pyer və Mikelon, Sent-Mert və Sent Varfolomey kimi Fransa müstəmləkələrinin xalqları, eləcə də Niderlandın Aruba, Kurasao, Sənt-Maarten, Boneyr, Sent Yefstaxiy və Saba kimi müstəmləkələrinin xalqları, – gəlin, həmin ərazidəki xalqları alqışlayaq, – bu gün XXI əsrdə də müstəmləkə hakimiyyətindən əziyyət çəkirlər”. [13] 1966-1996-cı illər ərzində Fransa Polineziyası Fransanın apardığı 193 nüvə sınağı səbəbindən ətraf mühitin ciddi pozulması ilə üzləşib. Fransa orada torpaq və suyun kəskin dərəcədə zəhərlənməsi və radiasiyasına görə məsuliyyət daşıyır. Radiasiya səviyyəsi 4900 faizi keçib.

Bu məsələ BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası (COP29) çərçivəsində Azərbaycan Milli QHT Forumu Pavilyonunda Bakı Təşəbbüs Qrupu (BTQ) tərəfindən təşkil olunan “Ekomüstəmləkə: müstəmləkə və neokolonial istismarın ətraf mühit mirası” adlı beynəlxalq konfransın müzakirə predmetinə də çevrildi.

Beynəlxalq konfransda hələ də müstəmləkə idarəçiliyi altında olan xalqlar, müstəmləkəçi dövlətlər tərəfindən təbii resursların istismarı, meşələrin qırılması, xlordekonla torpağın çirklənməsi və məcburi kənd təsərrüfatı monokulturası kimi tarixi müstəmləkəçilik təcrübələrindən söz açıldı. Bu xalqların üzləşdiyi iqlim böhranları, onların uzunmüddətli mənfi ekoloji nəticələri ilə bağlı müzakirələr aparıldı. Tədbirdə Fransa və Niderland müstəmləkəsi altında olan xalqların nümayəndələri ölkələrindəki ətraf mühitin acınacaqlı vəziyyətindən danışdılar. Bu baxımdan Fransa hökumətinin fransız Polineziyasında, Qvadelupada, Martinikada, Mayotda, Yeni Kaledoniyada həyata keçirdiyi nüvə sınaqları, istifadə etdiyi zəhərli pestisidlərin ağır nəticələri xüsusi vurğulandı.

Qeyd edildi ki, Fransanın müstəmləkəsi altında olduğu üçün müstəqil qərar qəbul edə bilməyən Qvadelupada kənd təsərrüfatı sahələrinin əksəriyyəti çox təhlükəli olan xlordekon pestisidi ilə zəhərlənib və bu, biomüxtəlifliyi məhv edib. Dünyada bu zəhərli maddənin istifadəsinin ləğv edilməsinə baxmayaraq, Fransa hökuməti Qvadelupada və Martinikada bu pestisiddən hələ də istifadə edir. Nəticədə, həmin ərazilərdə kənd təsərrüfatının inkişafı mümkün deyil.

Çıxışlarda, həmçinin Fransız Polineziyasında Fransa tərəfindən həyata keçirilən nüvə sınaqlarının ekoloji fəsadlarının yaratdığı dəhşətli vəziyyət, radiasiyaya məruz qalmış əhaliyə Fransa tərəfindən kompensasiyanın hələ də ödənilməməsi, Yeni Kaledoniyada nikel yataqlarının istismarı, eləcə də Mayotun istismarı nəticəsində müxtəlif xəstəliklərin yayılması diqqətə çatdırılıb. Fransa və Niderlanddan yerli xalqların tələblərinə əməl etmək tələb edilib. [14]

Noyabrın 14-də COP29 çərçivəsində növbəti əhəmiyyətli tədbirlərdən biri – İqlim, innovasiya, yaşıl iqtisadiyyat və ticarət üçün Türk Dövlətləri Təşkilatının (TDT) Tərəfdaşlığına dair Nazirlər Görüşü keçirildi. Məlum olduğu kimi, TDT türkdilli ölkələr arasında hərtərəfli əməkdaşlığa yardım edən beynəlxalq hökumətlərarası təşkilatdır. Təşkilat türkdilli ölkələrin dövlət başçılarının 2009-cu ilin 3 oktyabrında Naxçıvan

şəhərində keçirilən Zirvə Görüşündə imzalanmış Naxçıvan Sazişinə əsasən 2012-ci ilin 1 noyabr tarixində yaradılıb. TDT-nin mütəmadi olaraq Zirvə görüşləri və digər toplantıları keçirilir. COP29 da bu baxımdan istisna olmadı. Belə ki, iqlim dəyişmələrinə həsr olunmuş sözügedən tədbirdə qeyd olundu ki, müxtəlif istiqamətlər üzrə ölkələrarası tərəfdaşlığın və inteqrasiya proseslərinin güclənməsi ümumi rifah və qlobal çağırışlara adekvat yanaşma baxımından önəm kəsb edir. Tərəfdaşlıq vasitəsilə üzv dövlətlər davamlı inkişafa, iqlim problemlərinin həllinə və regional iqtisadi artımın təşviqinə sadiqliklərini nümayiş etdirirlər. TDT üzvlərinin vahid mövqelərinə görə, Azərbaycan türk dövlətləri arasında tərəfdaşlığın güclənməsinə mühüm töhfələr verməkdədir. Tədbirdə təşkilata üzv dövlətlərin müvafiq dövlət qurumlarının rəhbərlərinin İqlim, innovasiya, yaşıl iqtisadiyyat və ticarət üçün TDT Tərəfdaşlığının yaradılmasına dair Bakı Nazirlər Bəyanatı imzalandı.

Asiya İnkişaf Bankı tərəfindən 2001 -ci ildə təsis edilmiş Mərkəzi Asiya Regional iqtisadi Əməkdaşlıq (CAREC) Proqramı 11 ölkəni (Əfqanıstan, Azərbaycan, Çin, Gürcüstan, Qazaxıstan, Qırğızıstan, Monqolustan, Pakistan, Tacikistan, Türkmənistan və Özbəkistan) ehtiva edir. CAREC tərəfdaşlıq çərçivəsində eyni zamanda 6 çoxtərəfli maliyyə institutunu (Asiya İnkişaf Bankı, Avropa Yenidənqurma və İnkişaf Banki, Beynəlxalq Valyuta Fondu, BMT-nin İnkişaf Proqramı və Dünya Bankı) özündə birləşdirir. Proqramın əsas məqsədi əməkdaşlıq vasitəsilə sürətli iqtisadi inkişafın və yoxsulluğun azaldılmasına nail olmaqdır.

2024-cü ilin doqquz ayı ərzində Azərbaycan ilə CAREC-ə üzv dövlətlər arasında ticarət dövriyyəsi təqribən 4 milyard dollara çatıb, CAREC ölkələrinin Azərbaycanın ümumi xarici ticarətində payı isə 11,5 faiz təşkil edib. Noyabrın 14-də COP29 çərçivəsində İqtisadiyyat Nazirliyinin təşkilatçılığı ilə İqlim, İnnovasiya və Ticarət üzrə CAREC Tərəfdaşlığına həsr olunmuş Yüksək Səviyyəli Sessiya keçirildi. Tədbirdə "İqlim, İnnovasiya və Ticarət üzrə CAREC Tərəfdaşlığına dair Bakı Bəyannaməsi" imzalandı. Bu sənəd əsasında regionda sosial, iqtisadi və ekoloji sahələrdə təşəbbüsləri dəstəkləyən yeni platforma formalaşdırılacaq. Bundan başqa, bu çərçivədə yeni yaşıl prinsiplərin qəbul edilməsi prosesləri asanlaşacaq, ticarət və iqlim dəyişikliyi üzrə dialoq təşviq ediləcək.

Noyabrın 15-də BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası (COP29) çərçivəsində "Xalis Sıfır Xəritəsi: Dayanıqlı enerji sisteminin qurulması" mövzusunda panel keçirildi. Tədbirdə Paris Sazişində qeyd olunan əsas məqsəd və ssenarilərə diqqət yetirildi, eyni zamanda xalis sıfır emissiyalarına doğru qlobal keçid araşdırıldı. Paneldə sənayelərin yeni enerji modellərinə necə keçdiyi və yaşıl texnologiyalara sərmayə qoyduğu barədə mövzular gündəmə gətirildi.

### *5.Alternativ enerji növlərinin tətbiq edildiyi sahələr*

COP29 çərçivəsində təşkil edilən növbəti mühüm tədbir də alternativ enerji növlərinin tətbiq edildiyi sahələrin getdikcə genişləndirilməsi məsələlərinə həsr edilmişdi. Belə ki, regionda bərpaolunan enerjinin tətbiqini sürətləndirmək və yaşıl sənayeləşməni təşviq etmək məqsədilə Mərkəzi Asiyada Enerji keçidi üzrə İnvestisiya Forumu keçirildi. Forumda Azərbaycanla yanaşı, Qazaxıstan, Qırğız Respublikası, Tacikistan, Özbəkistan və Birləşmiş Ərəb Əmirliklərindən olan nazirlər, nazir müavinləri iştirak etdilər.

Forumda Mərkəzi Asiya ölkələrində artan enerji tələbatını ödəmək, enerji mənbələrinin müxtəlifliyini təmin etmək, iqtisadi artımı dəstəkləmək və iqlim məqsədlərinə nail olmaq üçün yaşıl enerjidən istifadəni artırmağın yolları müzakirə edildi. Bu məqsədlərə çatmaq istiqamətində "Mərkəzi Asiyada Sürətləndirilmiş Bərpa Olunan Enerji Tərəfdaşlığı" (APRECA) adlı proqram təsis edilib. Proqram Mərkəzi Asiya ölkələrinin potensialını səfərbər edərək regional əməkdaşlıq çərçivəsində investisiyaların genişləndirilməsini, regionlararası əlaqələrin gücləndirilməsini və sosial-iqtisadi faydaların artırılmasını hədəfləyir. [15]

Mərkəzi Asiyada Enerji Keçidi üzrə İnvestisiya Forumu regionda dayanıqlı enerji transformasiyasını sürətləndirmək, bərpaolunan enerji sahəsində əməkdaşlığı dərinləşdirmək və strateji layihələrin reallaşdırılması üçün investorları cəlb etmək baxımından mühüm platformadır. Respublikamız Mərkəzi Asiya ölkələri ilə bir çox sahələrdə olduğu kimi, yaşıl enerjiyə keçid sahəsində də güclü əməkdaşlığa böyük önəm verir.

COP platformasında 5 komponentdən ibarət olan 3 əsas enerji təşəbbüsü elan edilib. Birinci təşəbbüs, tamamilə Azərbaycan təcrübəsinə əsaslanan və yaşıl enerji dəhlizlərinin, həmçinin yaşıl enerji zonalarının yaradılmasını təşviq edən "Yaşıl Enerji Vədi"dir. İkinci təşəbbüs "Enerji Saxlama və Şəbəkələr Öhdəliyi"dir ki, bu da 2030-cu ilə qədər qlobal enerji saxlama gücünü altı dəfə artıraraq 1500 GW-a çatdırmağı və 2040-cı ilə qədər 90 milyon km şəbəkə əlavə etməyi hədəfləyir. Üçüncü təşəbbüs isə "COP29 Hidrogen Bəyannaməsi"dir. Həm dövlət, həm də özəl sektorlar üçün bu bəyannamənin məqsədi tənzimləyici, texnoloji, maliyyələşdirmə və standartlaşdırma maneələrinin həll edilməsi üzrə rəhbər prinsip və prioritetlərlə yanaşı, təmiz hidrogen və onun törəmələri üzrə qlobal bazarın potensialından istifadəni təmin etməkdir.

Bu təşəbbüslər Azərbaycanı bərpa olunan enerjinin inkişafı və ixracında lider mövqeyə yüksəltməklə yanaşı, genişmiqyaslı ötürmə, uzaq potensial enerji mənbələrinin istehlak mərkəzləri ilə əlaqələndirilməsi, enerji təchizatı ilə tələbat arasında tarazlığın təmin edilməsi və böyük həcmdə yaşıl enerji güclərinin şəbəkəyə inteqrasiyası ilə qlobal miqyasda təmiz enerjinin inkişafını sürətləndirmək üçün çox yaxşı perspekivə malikdir. COP29 bütün ölkələri bu öhdəliklərə qoşulmağa, enerji keçidimizi və iqlim fəaliyyətimizi gücləndirmək və dünyamız üçün dayanıqlı bir gələcək qurmaq naminə birliyə çağırır. [16]

Noyabrın 16-da COP 29 çərçivəsində "Bakı Beynəlxalq Dəniz Ticarət Limanı" QSC (Bakı Limanı), ADA Universiteti, IDEA İB, "Caspian İntegrated Scientific Network" (CASPISNET), ABŞ-ın Kaliforniya Universiteti (UCLA) və BMT-nin Ətraf Mühit Proqramı (ƏMP) tərəfindən birgə təşkil olunan "Xəzər dənizi hövzəsi: risklərin qiymətləndirilməsi və aradan qaldırılması" mövzusunda dəyirmi masa təşkil edildi. Heydər Əliyev Fondunun vitse-prezidenti, IDEA (Ətraf Mühitin Mühafizəsi Naminə Beynəlxalq Dialoq) İctimai Birliyinin təsisçisi və rəhbəri Leyla Əliyeva müzakirələrdə iştirak edib.

Tədbirdə Leyla Əliyeva Xəzər dənizinin ətraf mühitinin mühafizəsinin əhəmiyyətini vurğulayaraq, dünya göllərinin ümumi su ehtiyatlarının 40 faizdən çoxunu təşkil edən Xəzər dənizinin malik olduğu zəngin ekosistem barədə tədbir iştirakçılarına məlumat verdi. Onun sözlərinə görə, Xəzər dənizində yaşanan problemlər bir sıra canlıların, o cümlədən suitilər, nərə və qızılbalıqların populyasiyasına yetərinə mənfi təsir göstərir. Ətraf mühitin mühafizəsi sahəsində gənclərin roluna böyük önəm verən Leyla Əliyeva Xəzər dənizinin gələcək nəsillər üçün qorunub saxlanılması istiqamətində çalışacaq gənc mütəxəssislərin yetişdirilməsini əhəmiyyətli hesab edib.

Xəzər dənizinin unikal ekoloji sisteminin qorunması naminə monitorinq və davamlı təhlillərin aparılması vacibdir. Bu məqsədlə beynəlxalq ekspertlər və tədqiqat mərkəzlərinin nümayəndələrinin birgə layihə və təşəbbüslərlə çıxış etməsi məqsədəuyğundur. COP29 çərçivəsindəki tədbirdə Xəzər dənizində müşahidə olunan hərtərəfli problemlərin öyrənilməsi və onların mümkün həll yollarına dair təkliflərin irəli sürülməsi məqsədilə Xəzər İqlim və Dayanıqlılıq Mərkəzinin yaradılması elan edilib.

Növbəti vacib sənədlərdən biri noyabrın 19-da imzalandı. Belə ki, BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası (COP29) çərçivəsində İslam Dünyası Təhsil, Elm və Mədəniyyət Təşkilatı (ICESCO) ilə IDEA (Ətraf Mühitin Mühafizəsi Naminə Beynəlxalq Dialoq) İctimai Birliyi arasında niyyət protokolunun imzalanma mərasimi keçirildi. Niyyət protokolunun məqsədi iqlim dəyişmələri ilə mübarizə sahəsində ICESCO ilə IDEA arasında ikitərəfli əməkdaşlığın

genişləndirilməsi, ətraf mühitin qorunmasına yönələn tədbirlərdə birgə iştirak və hər iki təşkilatın fəaliyyət istiqamətləri ilə uyğunluq təşkil edən digər müvafiq fəaliyyətlərin müştərək icrasından ibarətdir. Hər iki təşkilat ICESCO-ya üzv dövlətlərdə ətraf mühitin mühafizəsi, torpağın deqradasiyasının qarşısının alınması, qida və su təhlükəsizliyinin təmin olunması, məlumatlandırma işlərinin aparılması, birgə tədqiqat işləri və pilot layihələrin həyata keçirilməsi, gənclərin və könüllülərin iştirakçılığının artırılması, mübadilə proqramlarının icrası, eləcə də bilik və ən yaxşı təcrübələrin paylaşılması istiqamətində əməkdaşlığın genişləndirilməsinə dair razılığa gəldilər. [17]

***6.Nəticə***

Hesab edirik ki, COP29 çərçivəsində keçirilən və önəmli əhəmiyyət kəsb edən tədbirlərdən biri də "Su, enerji, ərzaq və ekosistemlər üzrə əməkdaşlıq vasitəsilə iqlim fəaliyyətlərinin sürətləndirilməsi" mövzusunda konfrans idi. Tədbirdə qeyd olundu ki, iqlim dəyişmələri getdikcə su, ərzaq və ekosistemə daha çox təsir edir. "Regional əməkdaşlıq üzrə perspektivlər" mövzusunda panel müzakirələrdə çıxışı zamanı BMT-nin Ərzaq və Kənd Təsərrüfatı Agentliyinin (FAO) Avropa və Mərkəzi Asiya üzrə regional nümayəndəsi Viorel Gutu hazırda dünyada 730 milyon insanın aclıqla üz-üzə qaldığını açıqladı. Onun sözlərinə görə, 2050-ci ilə kimi dünya əhalisinin 10 milyarda çatacağı proqnozlaşdırılır və buna görə də ərzaq istehsalı 2 dəfədən çox artırılmalıdır. FAO rəsmisinin sözlərinə görə, təbiətdən dayanıqlı istifadə edilməsə, böhranın qarşısını almaq mümkün olmayacaq. [18]

Noyabrın 21-də Ekologiya və Təbii Sərvətlər Nazirliyinin (ETSN), IDEA (Ətraf Mühitin Mühafizəsi Naminə Beynəlxalq Dialoq) İctimai Birliyinin (İB) və Ümumdünya Təbiəti Mühafizə Fondunun (WWF) birgə təşkilatçılığı ilə COP29 çərçivəsində "Dəyişən iqlim şəraitində bəbirlərin mühafizəsi" mövzusunda panel müzakirələri keçirildi. Heydər Əliyev Fondunun vitse-prezidenti, IDEA İB-nin təsisçisi və rəhbəri Leyla xanım Əliyeva tədbirin açılışında çıxış edərək iqlim dəyişmələrinin və qlobal ekoloji sistemdə mənfi tendensiyaların müşahidə edilməsinin Qafqaz bəbirləri də daxil olmaqla, bir çox canlının populyasiyasını təhlükə altına qoyduğuna diqqəti cəlb etdi. Bildirdi ki, temperaturun yüksəlməsi və digər çoxsaylı təbii kataklizmlər bəbirlərin təbiətdə sağ qalmasını çətinləşdirir. O, bəbirlərin səmərəli mühafizəsini təmin etmək məqsədilə qlobal səyləri daha da möhkəmləndirməyə çağırdı. Həmin gün COP29 Sədrliyi, IDEA İB və Beynəlxalq Təbiəti Mühafizə İttifaqının (BTMİ) birgə təşkilatçılığı ilə keçirilən "*Qlobal liderlərin dialoqu: Təbiət üçün müsbət gələcəyə nail olmaq məqsədilə iqlim fəaliyyəti və biomüxtəlifliyin qorunması və Paris Sazişinin məqsədlərinə uyğunlaşdırılması*" mövzusunda panel müzakirələrində də Leyla xanım Əliyeva iştirak etdi. O, iqlim dəyişmələrinin və biomüxtəlifliyin itirilməsinin planetimizə vurduğu zərərin miqyaslarını vurğulayaraq, beynəlxalq ictimaiyyət tərəfindən təcili tədbirlərin görülməsinin zəruri olduğunu bildirib. [19]

Bir çox ilklərə imza atan və yüksək səviyyədə keçirilən COP29 eyni zamanda məhsuldarlığı ilə də yadda qalmışdır. Belə ki, artıq yuxarıda da vurğuladığımız kimi COP29-un keçirildiyi elə bir gün olmadı ki, çoxsaylı toplantılar keçirilməsin və bu tədbirlərdə mühüm qərarlar qəbul edilməsin. Bunlardan yalnız bəzilərinin adlarını xatırlatmaqla kifayətlənmək məcburiyyətindəyik. COP29 çərçivəsində "Dayanıqlı, rəqəmsal Orta Dəhliz və onun hüdudlarından kənar" mövzusunda nazirlərin dəyirmi masası, "Azərbaycan Dəmir Yolları" QSC (ADY) və Beynəlxalq Dəmir Yolları İttifaqının (UIC) birgə təşkilatçılığı ilə "Nəqliyyat dəhlizləri ilə dayanıqlı gələcəyə doğru: İqlim siyasətində dəmir yolları" adlı tədbir, "Beynəlxalq aviasiya və iqlim dəyişikliyi" adlı yüksəksəviyyəli panel müzakirəsi, "İqlim fəaliyyətinin təkmilləşdirilməsi üçün innovativ həllər və gələcək addımlar" mövzusunda dəyirmi masa, "Şəhərlərdə təbiət, sağlamlıq və dayanıqlılıq" mövzusunda yüksək səviyyəli dəyirmi masa, "Yaşıl binalar və tikinti sektorunun

dekarbonizasiyası" mövzusunda panel və s. çox əhəmiyyətli tədbirlər keçirilmiş, müvafiq qərarlar qəbul edilmişdir. Yaşıl Şəhər Liderlərinin Dəyirmi Masasında SPECA İqlim Ağıllı Şəhərlər Forumu üzrə Bakı Bəyannaməsi imzalanmış, "Xəzəryanı dövlətlərin nazirlərinin və yüksəkvəzifəli şəxslərinin Xəzər dənizi səviyyəsinin azalması ilə bağlı əməkdaşlığın gücləndirilməsi haqqında Bəyannamə" qəbul edilmiş, "SOCAR Green" və "PowerChina" şirkətləri arasında Azərbaycanda bərpa olunan enerji layihələrinin inkişafında birgə imkanların araşdırılması məqsədilə Anlaşma Memorandumu imzalanmış, "Qlobal İqlim Şəffaflığı üzrə Nazirlərin dəyirmi masa"sı Bakı Bəyannaməsi qəbul olunmuşdur və s.

Noyabrın 23-də BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının (COP29) bağlanış plenar iclası keçirildi. COP29 çərçivəsində keçirilmiş müzakirələrin hesabatları və iclasların protokolları, həmçinin razılaşdırılmış sənədlər təsdiqləndi. COP29-un yüksək səviyyədə təşkilinə görə Azərbaycana rəsmi şəkildə təşəkkür elan edilməsi barədə qətnamə qəbul olundu.

Noyabrın 24-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev sosial şəbəkə hesablarında "COP29 iqlim diplomatiyasında dönüş nöqtəsidir!" sərlövhəsi ilə paylaşımda Bakıda çox yüksək səviyyədə təşkil edilmiş və başa çatmış COP29 barədə bildirmişdir: "*Müddətin qısa olmasına baxmayaraq, Azərbaycan COP-un rahat və yüksək səviyyədə keçirilməsi üçün bütün lazımi hazırlıqları həyata keçirməyə nail oldu. Mübaliğəsiz deyə bilərik ki, Bakı COP tədbiri ən möhtəşəm COP-lardan biri kimi tarixə düşəcək*".

Biz 80 dövlət və hökumət başçısının, qeydiyyatdan keçmiş 76 mindən çox iştirakçının qatıldığı COP29-un çox yaxşı təşkil olunması ilə bağlı bütün qonaqlardan yüksək qiymət almaqdan qürur duyuruq.

Genişmiqyaslı və planlaşdırılmış böhtan və qarayaxma kampaniyasına baxmayaraq, Azərbaycan iqlim danışıqlarında tarixi nəticələr əldə etməyə müvəffəq oldu.

"Yaşıl dünya naminə həmrəylik" şüarını rəhbər tutan Azərbaycan bitərəf vasitəçi kimi çıxış edərək danışıqların qərəzsiz aparılması üçün bütün imkanları yaratdı. Bütün proses boyu biz inkişaf etməkdə olan ölkələrin, xüsusilə kiçik ada dövlətlərinin və ən az inkişaf etmiş dövlətlərin ehtiyaclarını nəzərə alan nəticə əldə etməyə çağırış etdik, çünki onlar iqlim dəyişmələrinin ağır yükünü daşıyırlar və ekzistensial təhlükə ilə üzləşirlər. Biz, həmçinin müstəmləkə idarəçiliyi ilə daha da ağırlaşan ekoloji problemlərdən əziyyət çəkən xalqlar və regionlar ilə həmrəylik nümayiş etdirdik". [20]

Qeyd etdiyimiz kimi, COP29-un qəbul etdiyi qərarlar planetimizin gələcəyi üçün tarixi əhəmiyyət kəsb edən qərarlardır. Tədbirin sonunda yeni iqlim hədəfi - COP29-un əsas prioriteti olan iqlim maliyyəsi üzrə Yeni Kollektiv Kəmiyyət Hədəfi qəbul olunub. Hər il inkişaf etməkdə olan ölkələrə 1,3 trilyon dollar iqlim maliyyəsini yönəltməyi nəzərdə tutan yeni öhdəlik olan Bakı Maliyyə Məqsədi (BMG) barədə razılıq əldə edilib. Bakı Maliyyə Məqsədi, inkişaf etmiş ölkələrin 2035-ci ilə qədər inkişaf etməkdə olan dövlətlər üçün hər il ən azı 300 milyard dollar məbləğində vəsaitin səfərbər olunmasına rəhbərlik etməsini nəzərdə tutan əsas hədəfləri müəyyənləşdirir. 2015-ci ildən bəri ilk dəfə olaraq COP29-da Paris Sazişinin 6-cı maddəsi tam şəkildə işlək vəziyyətə gətirilib. 6-cı maddə ilə bağlı yekdilliklə qəbul edilən qərarlar ətraf mühitin bütövlüyünü, şəffaflığı və karbon bazarlarının möhkəmliyini təmin etməkdə mühüm rol oynayacaq. 2022-ci ildə təşəbbüs kimi irəli sürülmüş və iqlim dəyişmələrinin təsirlərinə ən çox məruz qalan ölkələrə maliyyə yardımını nəzərdə tutan İtki və Zərər Fondunun tam şəkildə institutlaşdırılması təmin edən qərar qəbul edilib. Fond artıq gələn ildən etibarən fəaliyyətə başlayacaq.

COP29-un Bakıda keçirilməsi ölkə ictimaiyyətinin iqlim dəyişikliyi və ətraf mühit problemlərinə həssaslığını artırmaq baxımından da əhəmiyyətli idi. Belə ki, qlobal istiləşmə, ekstremal hava hadisələri və bərpa olunmayan təbii sərvətlərin tükənməsi kimi məsələlərin müzakirəsi ictimaiyyəti bu problemlərin vacibliyi ilə daha yaxından tanış etmişdir. Dövlət qurumları karbon emissiyalarını azaltmaq üçün strateji planlar hazırlayacaq, özəl sektor isə

fəaliyyətlərində ekoloji standartlara daha çox əməl etməli olacaq. Bu yanaşma təkcə dövlət orqanlarının deyil, həm də biznes strukturlarının fəaliyyət istiqamətlərini dəyişdirməyə səbəb olacaq. Bu konfrans çərçivəsində təqdim olunan beynəlxalq təcrübə və texnologiyalar ölkədə bərpaolunan enerji mənbələrinin tətbiqini genişləndirəcək.

COP29 çərçivəsində həyata keçirilən müzakirələr və artıq qəbul edilmiş qərarlar ölkədə sosial məsuliyyət çərçivəsində icra edilən ekoloji layihələrin artmasına da imkan verəcək. Dövlət və özəl sektor tərəfindən ağacəkmə kampaniyaları, təkrar emal mərkəzlərinin yaradılması, şəhər ərazilərinin yaşıllaşdırılması kimi bir çox faydalı kampaniyalar daha intensiv hal alacaq. Bu layihələr təkcə ətraf mühitin mövcud durumunun yaxşılaşdırılmasına deyil, eyni zamanda, ictimaiyyətin həyat keyfiyyətinin yüksəldilməsinə səbəb olacaq. Xüsusilə şəhər ərazilərində yaşıllıq sahələrinin artırılması insanların sağlamlığına və sosial rifahına müsbət təsir göstərəcək. COP29 çərçivəsində Azərbaycanın inkişaf etmiş ölkələrin yaşıl iqtisadiyyat sahəsində və iqlim dəyişikliyinə qarşı mübarizə istiqamətində təcrübələrindən bəhrələnməsi üçün geniş imkanlar yaranıb. Azərbaycanın beynəlxalq səviyyədə nüfuzu artıb, ölkə gələcək ekoloji investisiyalar üçün daha cəlbedici bir məkana çevrilib.

COP29-un Azərbaycanda keçirilməsi ölkəmizin sosial, iqtisadi və ekoloji inkişafına töhfə verən strateji əhəmiyyətli bir addımdır. Bu tədbir vasitəsilə Azərbaycan yalnız qlobal iqlim mübarizəsində fəal iştirak etməklə kifayətlənməyəcək, həm də öz vətəndaşlarının rifahını və gələcək nəsillərin sağlam yaşamaq hüququnu təmin etmək üçün mühüm addımlar atacaq. [21]

BMT-in ən mötəbər tədbirlərindən birinin Azərbaycanda keçirilməsi ölkəmizin daha bir qlobal təşəbbüsü dəstəkləməsi və bununla da, dünya ölkələri arasında nüfuzunun daha da artması deməkdir. Son illər dünyada beynəlxalq təşəbbüslərin lideri olaraq tanınan Azərbaycanın belə bir tədbirə ev sahibliyi etməsi ölkəmizin artan nüfuzunun göstəricisidir.

COP29 həm də qlobal məsələlərin müzakirə olunması, bu istiqamətdə qərarların qəbul olunması baxımından əhəmiyyətlidir. Konfransda müzakirə olunmuş məsələlər bir ölkənin deyil, bütün dünyanın problemləri kimi səciyyələndirilə bilər. Ona görə qlobal sahədə əldə edilən nəticələr ölkələrin bundan faydalanmasına imkan verəcək. Bu fürsətdən təkcə inkişaf etmiş deyil, həm də inkişaf etməkdə olan ölkələr də yararlanacaq.

## *7.REFERENCES*

**1.** Aliyev, H. (1997). *Our independence is eternal. First book*. Baku: Azerneshr, 612 p. (In Azerbaijani)
**2.** Aliyev, H. (1997). *The path of independence: Selected thoughts*. Baku, 136 p. (In Azerbaijani)
**3.** Aliyev, I. (2006). *Quotes and analysis*. Baku: Azerbaijan, 328 p. (In Azerbaijani)
**4.** Aliyev, I. (2009). *Development is our goal*. Baku: Azerneshr, 416 p. (In Azerbaijani)
**5.** Ilham Aliyev is a strong political leader safeguarding Azerbaijani statehood. *Yeni Azerbaijan.* Retrieved from https://www.yeniazerbaycan.com/Siyaset_e20795_az.html (In Azerbaijani)
**6.** The Constitution of the Republic of Azerbaijan. *Milli Majlis.* Retrieved from https://meclis.gov.az/documents/konstitusiya-az.pdf (In Azerbaijani)
**7.** State Program on the Use of Alternative and Renewable Energy Sources in the Republic of Azerbaijan. *E-qanun.* Retrieved from https://e-qanun.az/framework/5796 (In Azerbaijani)
**8.** State Agency for Renewable Energy Sources under the Ministry of Energy of the Republic of Azerbaijan. *AREA.* Retrieved from https://area.gov.az/az/page/haqqimizda (In Azerbaijani)

**9.** Presidential Decree of the Republic of Azerbaijan on declaring 2024 as the "Year of Solidarity for a Green World". *Official Website of the President of the Republic of Azerbaijan.* Retrieved from https://president.az/az/articles/view/62737 (In Azerbaijani)
**10.** Law of the Republic of Azerbaijan on the ratification of the Paris Agreement adopted at the 21st Conference of the Parties to the UN Framework Convention on Climate Change. *E-qanun.* Retrieved from https://e-qanun.az/framework/34278 (In Azerbaijani)
**11.** Opening speech by Ilham Aliyev at the Leaders' Summit of COP29 in Baku. *Official Website of the President of the Republic of Azerbaijan.* Retrieved from https://president.az/az/articles/view/67324 (In Azerbaijani)
**12.** "COP29 is not an arena for political attacks" - Mehriban Aliyeva. *Qafqazinfo*. Retrieved from https://qafqazinfo.az/news/detail/cop29-siyasi-hucumlar-arenasi-deyil-mehriban-eliyeva-452987 (In Azerbaijani)
**13.** Speech by Ilham Aliyev at the Summit of Small Island Developing States within COP29. *Official Website of the President of the Republic of Azerbaijan.* Retrieved from https://president.az/az/articles/view/67325 (In Azerbaijani)
**14.** COP29: The Baku Initiative Group organized an international conference on ecological damage caused by colonial powers. *AZERTAC.* Retrieved from https://azertag.az/xeber/cop29_baki_tesebbus_qrupu_mustemlekechi_guclerin_vurdugu_ekoloji_ziyana_dair_beynelxalq_konfrans_teskil_edib-3278136 (In Azerbaijani)
**15.** The Accelerated Renewable Energy Partnership Program in Central Asia has been established. *Xalq Xeber.* Retrieved from https://xalqxeber.az/society/109204-orta-asiyada-suretlendirilmish-berpa-olunan-enerji-terefdashligi-proqrami-tesis-edilib.html (In Azerbaijani)
**16.** A press conference was held with the participation of the Minister of Energy at the COP29 event. *Ministry of Energy of Azerbaijan.* Retrieved from https://minenergy.gov.az/az/xeberler-arxivi/00407 (In Azerbaijani)
**17.** A memorandum of intent was signed between IDEA and ICESCO. *Caspian Energy.* Retrieved from https://caspianenergy.net/index.php/az/caspian-energy-media/events-az/item/6723-idea-il-icesco-aras-nda-niyy-t-protokolu-imzalan-b (In Azerbaijani)
**18.** UN official: Climate change will lead to scarcity of drinking and irrigation water. *Azerbaijan News.* Retrieved from https://azerbaijan-news.az/az/posts/detail/bmt-nin-resmisi-iqlim-deyisikliyi-icmeli-ve-suvarma-suyu-qitligina-getirib-cixaracaqnbspnbsp-1732040969/344931 (In Azerbaijani)
**19.** Vice-President of the Heydar Aliyev Foundation Leyla Aliyeva participated in the Global Leaders' Dialogue within COP29. *Azerbaijan News.* Retrieved from https://azerbaijan-news.az/az/posts/detail/heyder-eliyev-fondunun-vitse-prezidenti-leyla-eliyeva-cop29-cercivesinde-qlobal-liderlerin-dialoqunda-istirak-edibnbspnbsp-1732210869/345251 (In Azerbaijani)
**20.** President Ilham Aliyev: COP29 is a turning point in climate diplomacy! *Trend News.* Retrieved from https://az.trend.az/azerbaijan/politics/3974553.html (In Azerbaijani)
**21.** Social, public, and ecological benefits of hosting COP29 in Azerbaijan. *AZERTAC.* Retrieved from https://azertag.az/xeber/cop29_un_azerbaycanda_kechirilmesinin_sosial_ictimai_ve_ekoloji_ustunlukleri-3291180 (In Azerbaijani)
**22.** Huseynova, I. (2021). *Ilham Aliyev and the glorious pages of our victory history*. Baku: Fuyuzat, 224 p. (In Azerbaijani)
**23.** Huseynova, I. (2016). *History. Time. Reflections. Vol. I*. Baku: Science and Education, 512 p. (In Azerbaijani)
**24.** Huseynova, I. (2019). *History. Time. Reflections. Vol. II*. Baku: Science and Education, 552 p. (In Azerbaijani)

## *ƏDƏBİYYAT*


1. Əliyev, H. (1997). *Müstəqilliyimiz əbədidir. Birinci kitab*. Bakı: Azərnəşr, 612 s.
2. Əliyev, H. (1997). *Müstəqillik yolu: Seçilmiş fikirlər*. Bakı, 136 s.
3. Əliyev, İ. (2006). *İqtibaslar və təhlil*. Bakı: Azərbaycan, 328 s.
4. Əliyev, İ. (2009). *İnkişaf – məqsədimizdir*. Bakı: Azərnəşr, 416 s.
5. İlham Əliyev Azərbaycan dövlətçiliyinin keşiyində duran güclü siyasi liderdir. *Yeni Azərbaycan*. Retrieved from https://www.yeniazerbaycan.com/Siyaset_e20795_az.html
6. Azərbaycan Respublikasının Konstitusiyası. *Milli Məclis*. Retrieved from https://meclis.gov.az/documents/konstitusiya-az.pdf
7. Azərbaycan Respublikasında alternativ və bərpa olunan enerji mənbələrindən istifadə olunması üzrə Dövlət Proqramı. *E-qanun*. Retrieved from https://e-qanun.az/framework/5796
8. Azərbaycan Respublikasının Energetika Nazirliyi yanında Bərpa Olunan Enerji Mənbələri Dövlət Agentliyi. *AREA*. Retrieved from https://area.gov.az/az/page/haqqimizda
9. Azərbaycan Respublikasında 2024-cü ilin "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. *Azərbaycan Respublikası Prezidentinin Rəsmi Saytı*. Retrieved from https://president.az/az/articles/view/62737
10. Birləşmiş Millətlər Təşkilatının İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyası ilə bağlı Tərəflərin 21-ci Konfransında qəbul olunmuş Paris Sazişinin təsdiq edilməsi haqqında Azərbaycan Respublikasının Qanunu. *E-qanun*. Retrieved from https://e-qanun.az/framework/34278
11. Bakıda COP29-un Liderlər Sammitinin açılış mərasimində İlham Əliyevin nitqi. *Azərbaycan Respublikası Prezidentinin Rəsmi Saytı*. Retrieved from https://president.az/az/articles/view/67324
12. "COP29 siyasi hücumlar arenası deyil" - Mehriban Əliyeva. *Qafqazinfo*. Retrieved from https://qafqazinfo.az/news/detail/cop29-siyasi-hucumlar-arenasi-deyil-mehriban-eliyeva-452987
13. COP29 çərçivəsində inkişaf etməkdə olan kiçik ada dövlətlərinin Sammitində İlham Əliyevin nitqi. *Azərbaycan Respublikası Prezidentinin Rəsmi Saytı*. Retrieved from https://president.az/az/articles/view/67325
14. COP29: Bakı Təşəbbüs Qrupu müstəmləkəçi güclərin vurduğu ekoloji ziyana dair beynəlxalq konfrans təşkil edib. *AZƏRTAC*. Retrieved from https://azertag.az/xeber/cop29_baki_tesebbus_qrupu_mustemlekechi_guclerin_vurdugu_ekoloji_ziyana_dair_beynelxalq_konfrans_teskil_edib-3278136
15. *Orta Asiyada Sürətləndirilmiş Bərpa Olunan Enerji Tərəfdaşlığı* proqramı təsis edilib. *Xalq Xəbər*. Retrieved from https://xalqxeber.az/society/109204-orta-asiyada-suretlendirilmish-berpa-olunan-enerji-terefdashligi-proqrami-tesis-edilib.html
16. COP29 tədbirində energetika nazirinin iştirakı ilə mətbuat konfransı keçirilib. *Azərbaycan Energetika Nazirliyi*. Retrieved from https://minenergy.gov.az/az/xeberler-arxivi/00407
17. IDEA ilə ICESCO arasında niyyət protokolu imzalanıb. *Caspian Energy*. Retrieved from https://caspianenergy.net/index.php/az/caspian-energy-media/events-az/item/6723-idea-il-icesco-aras-nda-niyy-t-protokolu-imzalan-b
18. BMT-nin rəsmisi: İqlim dəyişikliyi içməli və suvarma suyu qıtlığına gətirib çıxaracaq. *Azərbaycan Xəbərləri*. Retrieved from https://azerbaijan-news.az/az/posts/detail/bmt-nin-resmisi-iqlim-deyisikliyi-icmeli-ve-suvarma-suyu-qitligina-getirib-cixaracaqnbspnbsp-1732040969/344931

**19.** Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla Əliyeva COP29 çərçivəsində Qlobal Liderlərin Dialoqunda iştirak edib. *Azərbaycan Xəbərləri*. Retrieved from https://azerbaijan-news.az/az/posts/detail/heyder-eliyev-fondunun-vitse-prezidenti-leyla-eliyeva-cop29-cercivesinde-qlobal-liderlerin-dialoqunda-istirak-edibnbspnbsp-1732210869/345251
**20.** Prezident İlham Əliyev: COP29 iqlim diplomatiyasında dönüş nöqtəsidir! *Trend Xəbərləri*. Retrieved from https://az.trend.az/azerbaijan/politics/3974553.html
**21.** COP29-un Azərbaycanda keçirilməsinin sosial-ictimai və ekoloji üstünlükləri. *AZƏRTAC*. Retrieved from https://azertag.az/xeber/cop29_un_azerbaycanda_kechirilmesinin_sosial_ictimai_ve_ekoloji_ustunlukleri-3291180
**22.** Hüseynova, İ. (2021). *İlham Əliyev və zəfər tariximizin şanlı səhifələri*. Bakı: Füyuzat, 224 s.
**23.** Hüseynova, İ. (2016). *Tarix.Zaman.Düşüncələr. I cild*. Bakı: Elm və təhsil, 512 s.
**24.** Hüseynova, İ. (2019). *Tarix.Zaman.Düşüncələr. II cild*. Bakı: Elm və təhsil, 552 s.